sxemlər işləyib hazırlamışdır. Bu sferada hüquq mühafizə məsələləri həll olunmayan problem kimi qalır. Çünki bəzən heyvanların rifahı daha yaxşı və səmərəli istehsal kimi yox, iqtisadi maneə kimi qəbul edilir (10).

## Nəticə

İttifaq dünyanın ən böyük qida idxalçılarından biridir. Ərzaq bazarının qloballaşması Aİ qaydalarının o cümlədən, heyvanların rifahı ilə bağlı qaydalarının tətbiq edilməsinə təsir göstərir. İndiyə qədər Aİ beynəlxalq aləmdə öz ərzaq standartlarını uğurla təbliğ etmişdir. Aİ bu sferada aparmış olduğu siyasət sübut etmişdir ki, Aİ-nin hüdudlarından kənarda da istehlakçılar yüksək keyfiyyət standartlarını qiymətləndirir. Düşünürük ki, İttifaqın bu siyasəti mütəmadi olaraq davam etdirilməli və gözlənilən nəticələr əldə olunmalıdır.

Nəhayət yekun olaraq qeyd edək ki, AİFM m.13 Aİ xüsusi siyasətini müəyyənləşdirir. Lakin bu siyasəti müəyyənləşdirdiyi zaman bəzi sahələri nəzər almır ki, bunlardan ətraf mühitin adını qeyd edə bilərik. Lakin bunun olmaması, Aİ-ni heyvanların müdafiəsi sferasında müəyyən olunmuş siyasət həyata keçirməsinə maneə yaratmır.

## Ədəbiyyat

1. https://www.jus.uio.no/english/services/library/treaties/09/9-01/tfeu_cons.xml
2. Adzitey, F., Nurul, H. (2011). Pale soft exudative (PSE) and dark firm dry (DFD) meats: Causes and measures to reduce these incidences - A mini review. International Food Research Journal, 18:11-20.
3. https://www.animallaw.info/treaty/european-convention-protection-animals-during-international-transport
4. Passantino, A. (2006). Animal welfare and protection during transport: The current legislative framework in European Union. Ann Ist Super Sanita, 42 (2): 222-230.
5. https://www.legislation.gov.uk/eur/2005/1
6. Council Regulation. (2009). (EC) No 1099/2009 of 24 September 2009 on the protection of animals at the time of killing. Official Journal of the European Union, L 303/1. 18.11.
7. Blokhuis, H. (2004). Recent developments in European and international welfare regulations. World's Poultry Science Journal, 60(4): 469-477.
8. http://www.evolutio.info/content/view/1969/5/
9. https://rm.coe.int/168007a67d
10. http://rawc.eu/wp-content/uploads/2017/03/5.-General-principles-of-Regulation-10992009-Desmond-Maguire.pdf

Göndərildi: 17.06.2021 Qəbul edildi: 13.08.2021

DOI: 10.36719/2706-6185/04/33-37

**Mirməhəmməd Mirzahid oğlu Kazımov**
Bakı Dövlət Universiteti
magistrant
mkazimov1997@gmail.com

# TƏBİİ EHTİYATLAR VƏ ONLARIN İQTİSADİ CƏHƏTDƏN İSTİFADƏ OLUNMASI MÖVZUSU MOTİVASİYA MƏRHƏLƏSİNDƏ TƏTBİQİ

**Xülasə**

Motivasiya mərhələsində təbii ehtiyatların sinif bölgüsü formalarını araşdırır. Bu mərhələdə təbii ehtiyatlardan istifadəni sinif-fəsil-mövzu ardıcıllığı ilə təhlil edir. Motivasiya blokunda bu məsələlərin həlli vasitələrini araşdırır. Şagirdlərin bu mərhələdə hansı bilik, bacarıq və vərdişlərə yiyələndiyini təhlil edir. Bu proseslərin həyata keçirildiyi üsul və vasitələri müəyyən edir.

***Açar sözlər:*** *təbii ehtiyyat, xəbərlər, insan təsərrüfatı, təhlil etmək, motivasiya bloku, mətn, xəritə-sxem, cədvəl, bilik, bacarıq, hafizə, ekoloji problemlər*

**Mirmahammad Mirzahid Kazimov**
Baku State University
master student
mkazimov1997@gmail.com

## Application of natural resources and their economic use in the motivational phase

**Abstract**

Explores the forms of class distribution of natural resources in the motivation phase. Analyzes the use of natural resources at this stage in a class-chapter-topic sequence. Investigates the means by which these issues are addressed in the motivation block. Analyzes what knowledge, skills and habits the students have acquired at this stage. It determines the methods and means by which these processes are carried out.

***Keywords****: natural resources, news, human economy, analyze, motivation block,text, map-scheme, knowledge, skill, memory, environmental challenges*

## Giriş

Motivasiya mərhələsi-mövzuda başlıq şəklində verilərək mövzu haqqında ilkin təsəvvürlərin yaranmasına, mövzu barəsində marağın yaradılmasına və şagirdlərin mövzuya motivə olunmasına xidmət edir. Əgər biz motivasiya mərhələsində təlimi düzgün təşkil edə bilsək işin demək olar ki, çox böyük hissəsini görmüş olarıq və təlimi düzgün şəkildə apara bilərik. Ona görədə bu mərhələnin əhatəli tədqiqi vacibdir. Motivasiya mərhələsində təbii ehtiyyatlar və onların istifadəsi mövzusunda tədqiqatlar aparılmasına, onların siniflər, fəsillər və mövzular üzrə necə təsvir edilməsinə dair araşdırmalar aparılır (Seyfullayeva).

**VI sinif** coğrafiya kurikulumunda təbii ehtiyyatlar mövzusunun motivasiya mərhələsində necə tətbiq edilməsini arşdıraq. “Yerin daxili quruluşu” mövzusunun motivasiya blokunda təbii ehtiyyatların və yerin daxili quruluşunun əlaqəsini göstərən mətn verilmişdir ki, bu da şagirdlərdə ilkin olaraq təbii eytiyyatların yerin dərinliyində olmasını göstərməyə istiqamətlənmişdir. Süxurlar mövzusunun motivasiya blokunda qeyri-filiz faydalı qazıntıları və onların nə məqsədlə istifadə edilməsinə dair hansı biliklərə malik olmağımızı soruşur bu da, hafizə və məntiqi təfəkkürün inkişafına imkan yaradır. Dağlar mövzusunun motivasiya blokunda qoyulmuş Abdulla Şaiqin “Köç” hekayəsinin bir hisəssi yerləşdirilmişdir. Bu hekayədə dağlarda hansı təbii ehtiyyatlara rast gəlməsinə, dağ relyefini beynimizdə canlandırmağa, mövzuya marağın artırılmasına və ilkin təsəvvürlərin yaranmasına şərait yaradır. Düzənliklər mövzusunda verilmiş 4 ədəd foto şəkil vasitəsilə motivasiya qurulur ki, bu da şagirdlərin

yaş səviyəsinə uyğun seçimidir. Bu şəkillər təbii ehtiyyatların və təbiətin müxtəliflik göstəricini nümayiş etdirir və mövzuya maraq artırır. Hava şəraiti mövzusunda motivasiya blokunda verilmiş ölkəmizin hava şəraitinə aid fotoşəkillərdən iqlim kimi zəngin təbii ehtiyyatını təsvir etmişdir. Ölkəmizin bu təbii ehtiyyatının digər ölkələrdən necə fərqələndiyinə dair suallar yerləşdirilmişdir ki, bu da prosedural biliklərin və mövzu ətrafında marağın artmasına şərait yaradır. Dünya okeanı mövzusunda motivasiya blokunda yerləşdirilmiş okanın zəngin təbii sərvətləri, bu sərvətlərin hansı məqsədlərlə istifadə olunması və məskunlaşmaq üçün hansı seçim etməyimizə dair verilən suallarda şagirdlərdə mövzu barəsində ilkin təsəvvürlərin yaranmasına və mövzuya marağın artmasına şərait yaradır. (2).Təbiətdə suyun dövranı mövzusunda həyatın var olmasına səbəb olan şirin su qaynaqlarının harada olması haqqında motivasiya bloku yerləşdirilmişdir. Bu blok şagirdləri su ehtiyyatlarını haqqında düşünməyə və onlardan düzgün istifadə etməyə, ekoloji tərbiyənin yaradılmasına istiqamətləndirir. Çaylar və göllər mövzularında motivasiya bloku şəkil, şeir və məlumat xarakterlidir. Bloklar şagirdlərdə su ehtiyyatına dair ilkin təsəvvürlərin yaranmasına imkan verir ki, bu da deklorotiv biliklərin başlanğıcı hesab edilir.Aral dənizi haqqında olan mövzuda isə Aral dənizinin dünəni və bu günü haqqında motivasiya bloku yerləşdirilmiş-dir. Bu dəyişikliklər şagirdlərdə ekoloji tərbiyənin formalaşmasına və konseptual biliklərin əldə edilməsi ilə tənqidi təfəkkürün inkişafına xidmət edir. Meşələr mövzusunda motivasiya blokunda "hərəyə bir ağac əkək" başlığında verilmiş başlıq və foto önəmli təbii ehtiyyat olan bitkilər haqqında məlumat almağa və ekoloji tərbiyənin formalaşmasına, prosedural biliklərlə yanaşı konseptual biliklərində əldə edilməsinə kömək edir. Torpaq mövzusunda motivasiya bloku maddi və mənəvi dəyər hesab edilən zəngin təbii sərvət olan torpaq və onun iqtisadi əhəmiyyətindən bəhs edilir.Amazon meşələri mövzusun-da ağacların zənginliyi, onların iqtisadi əhəmiyyəti və kortəbii istifadəsinin fəsadları haqqında motivasiya bloku yerləşdirilmişdir ki,bu mövzularda şagirdlərin konseptual biliklər əldə etməsi ilə yanaşı tənqidi təfəkkürün formalaşmasınada situmullaşdırcı kimi çıxış edir (3). Gecə və gündüzün dəyişməsi mövzunun motivasiya blokuda canlı aləmin müxtəlifliyini təsvir etməklə bu zəngin təbii sərvəti daha yaxından tanımağa sövq edir və şagirdlərin ətraf mühitə dair daha da humanist davranmasını aşılayır.

**VII sinif** coğrafiya kurikulumunda təbii ehtiyyatlar və onların iqtisadi cəhətdən istifadə olunması mövzularının motivasiya mərhələsini araşdıraq. Yeraltı sərvətlər mövzusu motivasiya mərhələsində verilmiş təbii sərvətlər və onların istifadəsinə dair şəkillər tətqiqat sualının verilməsinə və mövzuya marağın artırılmasına istiqamətlənir ki, bu da tətqiqatın daha dolğun və istiqamətli aparılmasına, yeni bilik və bacarıqların əldə edilməsinə imkan verir. Ölkəmizin faydalı qazıntıları mövzusunda faydalı qazıntılarımızın çıxarılması və nə məqsədlə istifadə olunması barəsində motivasiya qoyub, mövzu haqqında şəkillər və mətnlər vasitəsilə ilkin təsəvvürlər verək, şagirdlərin dərsə motivə olunmasına yardımçı olaraq onların konseptual biliklərə yiyələnməsini və milli ruhun inkişafını təmin edir. Yağıntı-ların paylanılması mövzusunda motivasiya mərhələsində verilmiş iqlim müxtəliflikləri mətni ölkəmizin zəngin iqlim ehtiyyatlarına malik olması təsəvvürünü formalaşdırmaq, şagirdlərdə mövzuya maraq yaratmaq və onlarda konseptual biliklərlə yanaşı məntiqi təfəkkürü inkişaf etdirir. İqlim mövzusunda da verilmiş fotoşəkil dünyanın iqlim ehtiyyatlarının zənginliyini göstərməyə istiqamətlənmiş və deklorotiv bilik olan fotoşəkillər vasitəsilə tətqiqata maraq yaradır. Çaylar mövzusunda kür çayının hidroloji potensialını ortaya qoyaraq motivasiya yaradır və deklorotiv biliklər verməklə hafizə təfəkkürünü inkişaf etdirir. Çaylarımızın ekoloji vəziyyəti mövzusunda isə içməli su qaynaqlarının illər boyu necə paylandığı və getdikcə bunun ciddi bir problem olacağını, insanların sayı ilə tərs mütənasib dəyişdiyini vizual şəkildə nümayiş etdirir. Bu motivasiya şagirdləri gələcək haqqında daha qənaətcil və mühiti sevmək istiqamətində motivasiya edir və tənqidi təfəkkürün inkişaf etməsinə imkan verir. Canlı aləmin müxtəlifliyi mövzusunun motivasiya mərhələsində verilmiş foto şəkildə dünyanın hər bir yerində canlı təbii ehtiyyatlarına rast gələ biləcəyimizə dair motivə edir və deklorotiv biliklərin mənbəyinə çevrilir. Torpaqların xüsusiyyətləri, quruluşu, müxtəlifliyi, mühafizəsi mövzularında və ölkəmizin torpaq, bitiki və heyevanlar aləmi mövzusunda verilmiş maraqlı tarixi rəvayətlə torpaqların zənginliyini və düzgün istifadə olunmazsa fəsadılarla qarşılaşa biləcəyimizi mətn və foto şəkillər vasitəsiylə göz önünə qoyaraq tənqidi təfəkkürün inkişafına zəmin yaradır. Türk dünyası mövzusunda bal arıları kimi əsrarəngiz canlıların təbii ehtiyyat kimi istifadəsini və xeyrindən bəhs edən motivasiya bloku verilmişdir. (4). Bu mərhələdə şagirdlərdə deklorotiv bilik inkişaf edir. Əhalinin məskunlaşması mövzusunda isə verilmiş fotoşəkillərdə müxtəlif təbii şəraiti özündə əks etdirən fotoşəkillər verilmişdir. İqtisadi fəaliyyət və

ölkəmizin iqtisadiyyatı mövzularında təbii resusların istifadəsi və yerlərinə dair motivasiya bloku verilir, bu da mövzu haqqında ilkin təsəvvürlərin meydana gəlməsinə və bu barədə faktoloji biliklərin inkişafına imkan verir.

**VIII sinif** coğrafiya kurikulumunda təbii ehtiyyatlar və onların iqtisadi cəhətdən istifadə olunması mövzularının motivasiya mərhələsini araşdırsaq görərik ki, motivasiya mərhələsi yalnız mətn bloku vasitəsilə verilmişdir. Bu bloklar şagirdləri lazımı səviyyədə dərsə maraqlandırmaya bilər. Bilirik ki, motivasiyanın başlıca məqsədi dərsə maraq yaratmaqdır. Bu sinifdə mövzuların başdan axıra qədər eyni mətn şəkilli motivasiya ilə verilməsi bir qədər əlverişli hesab edilmir. İndi isə motivasiya mərhələsində təbii ehtiyyatlar və onların istifadəsi haqqında hansı mövzularda bəhs edildiyini araşdıraq. Ölkəmizdə coğrafiya elminin inkişafı mövzusunda ölkəmizin təbii ehtiyyat potensialının genişliyi araşdırılması və istifadəsi haqqında mətndə məlumatlar verilmişdir ki, bu da şagirdlərdə milli ruhun inkişafına, bu istiqamətdə deklorotiv biliklərin əldə edilməsinə, hafizə və məntiqi təfəkkürün inkişafına imkan verir. (5). Qədim quru və su sahələri mövzusunda motivasiya mərhələsində təbii ehtiyyatlar və onların materiklər üzrə yayılması haqqında məlumatlar verir,onların müxtəliflikləri və yayılma arealları haqında nəzəri biliklər verərək şagirdlərdə hafizə təfəkkürünün inkişafına və mövzu ətrfında yeni araşdırmalar etməyə sövq edir. Yağıntıların paylanılması mövzusunda motivasiya blokunda yağıntının ərazi üzrə fərqli paylanmasının hansı dəyşikliklərə səbəb ola biləcəyi haqqında şagirdləri maraqlandıracaq mətn verərək şagirdlərdə prosedural biliklərin inkişafına və bunun nəticəsi olaraq konseptual biliklərin yaranmasına imkan verir. İqlim və onun yaranması mövzusunda isə iqlim ehtiyyatlarının ekvatordan qütblərə doğru necə dəyişməsini mətn vasitəsi ilə göstərən motivasiya bloku düşünməyə sövq edərək məntiqi təfəkkürün inkişafına imkan verir. Yerin su təbəqəsi fəsilində motivasiya bloklarında dünya okeanı kimi zəngin təbii ehtiyyatları kimyəvi tərkibi, hərəkəti, əhəmiyyəti və insan təsərrüfatında önəmli rolunu göstərmişdir. Bu fəsil vasitəsilə deklorotiv, prosedural biliklər vasitəsilə yeni biliklər əldə etməyə imkan verir. Biosfer fəsilinin mövzularıda motivasiya mərhələsində təbii ehtiyyatlar və onların istifadəsi baxımından təhlil edək. Biosferin Yer təbəqələri sistemində mövzusunda motivasiya blokunda canlıların inkişafı mərhələlərindən, şəraitindən və digər aləmlərlə qarşılıqlı əlaqəsindən; Coğrafi təbəqə mövzusunda isə motivasiya bloku canlılar aləmin inkişafında təbii ehtiyyatının və Günəş şüalarının qarşılıqlı əlaqəsindən; Bitki və heyvanat aləmi mövzusunda istilik və rütubətin paylanılmasının canlılar aləmində müxtəlifliyinin yaranmasına səbəb olduğu barəsində motivasiya bloku verilmişdir ki,bu da mövzu haqqında maraq oyanmasına və mövzunu haqqında faktoloji biliklərin vasitəsi ilə təfəkkürün inkişafına şərait yaradır. (6). Təbii zonalar mövzusunda isə ayrı-ayrı ərazilərdə təbii zonaların yaranma səbəbləri və onların canlı aləminin növləri haqqınnda motivasiya bloku verərək onların dərs haqqında deklorotiv biliklərə sahib olmasını təmin edir. Bu mövzulardan da görmək olar ki, mövzuların motivasiyasında canlı aləm təbii ehtiyyatlar haqqında məlumat olsada istifadəsi haqqında motivasiya qoyulmamışdır. Bu da ki, hafizə təfəkkürünün inkişafına imkan versədə, kompotensiyaların inkişafını təmin etmir. Təbii ehtiyyatlar və təbii ehtiyyatların təsərrüfat əhəmiyyəti mövzusunda motivasiya bloklarında ehtiyyatlar, onların istifadəsi haqqında və iqtisadi əhəmiyyəti haqqında mətndaxili məlumat verilmişdir ki,bu da şagirdlərdə mövzu haqqında ilkin təsəvvürlərin yaradılmasına, mövzuya marağın artırılmasına və deklorotiv biliklərin inkişafına şərait yaradır. Ekoloji mühit və onun mühafizəsi fəslində dünyada və ölkəmizdə ətraf mühiti çirkləndirən mənbələrin başında təbii ehtiyyatların düzgün şəkildə mənimsənilməməsi, bu istifadənin hansı fəsadlar əmələ gətirdiyini, bu fəsadların necə aradan qaldırılması barəsində, əgər vaxtında tədbirlər görülməzsə fəsadların sonun nə ilə nəticələnə biləcəyi barəsində məlumatlar üzərində motivasiya qurulmuşdur. Bu şagirdlərdə mövzuya maraqın artırılmasına, ekoloji tərbiyənin formalaşmasına və tənqidi təfəkkürün inkişafına imkan verir.

**IX sinif** coğrafiya kurikulumunda təbii ehtiyyatların və onların istifadəsinin motivasiya mərhələsində verilməsinə dair araşdırmalar aparaq. 8-ci sinifdən fərqli olaraq motivasiya blokları bu sinifdə yalnız mətnlərdən ibarət deyil. Bu sinifdə motivasiya bloklarında xəritələr,şəkillər və mətnlərin qarşılıqlı əlaqəsinə rast gələ bilərik. İqlim və onun təsərrüfatda rolu fəsilində "Günəş radiasiyası və iqilim", hər bir materikin iqlimi mövzuların motivasiya mərhələsində təbii ehtiyyat olan iqlim ehtiyyatları və onların təsərrüfata təsiri haqqında maraqlı mətn,xəritə və şəkillər verilmişdir ki, bu şagirdlərdə deklorotiv biliklər vasitəsilə həm məntiqi təfəkkürün həm də hafizənin inkişafına kömək edir. Motivasiya bloklarında materiklərin iqlimləri və onlara xas olan hava şəraiti,təbii hadisələr,bu hadisələrin təsərrüfata

təsiri, bu təsirləri azaldılması və proqnozlaşdırılması haqqında mətn, şəkil və xəritə üzərində iş verilmişdir ki, şagirdlərin mövzu haqqında vizual şəkildə məlumat almağa və motivasiya zamanı məntiqi təfəkkürün inkişafına imkan verir. Su ehtiyyatları və onların iqtisadi əhəmiyyəti fəslində materiklərin daxili suları, ölkəmizin su anbarları və kanalları mövzularında su kimi zəngin təbii ehtiyyatların,onların materiklər üzrə paylanılması, müxtəliflikləri, hidroloji xüsusiyyətləri və təsərrüfata təsiri haqqında verilmiş mətn və xəritə üzərində iş motivasiya mərhələsində mövzuya marağın artırılması, şagirdlərdə mövzu ətrafında ilkin təsəvvürlərin formalaşmasına və məntiqi, yaradıcı təfəkkürün inkişafına şərait yaradır. Dünya okeanından istifadə mövzusunda motivasiya mərhələsi qrafik üzrə iş blokundan ibarətdir. Bu blokun köməkliyi ilə prosedural və konseptual biliklər əldə edilir (7). Motivasiya blokunda verilən qrafikdə əhali və təbii ehtiyyatlar arasında nisbətin yüzilliklər boyu dəyişməsi verilmişdir ki, bu konseptual biliklərin əldə edilməsinə və məntiqi təfəkkürün inkişafına imkan verir. Bioehtiyyatların müxtəlifliyi və onlardan istifadə mövzusunda motivasiya mərhələsində materiklərin bioloji ehtiyyatından bəhs edən blok verilmişdir. Blokda verilən xəritə-sxem və Antraktika materik mövzusunda isə verilən şəkildə mövzuya maraq yaratmağa və mövzu haqqında ilkin biliklərin yaranmasına imkan verir. Ölkəmizin landşaftı mövzusunda motivasiya mərhələsində şəkil üzərində iş blokunda ölkəmizin təbii ehtiyyatını özündə əks etdirən iki şəkil, verilmiş ifadələri bu şəkillərə uyğun olaraq qruplaşdırmağı istəyir ki, bu məntiqi təfəkkürün inkişafını təmin edir. Ekoloji siyasət mövzusunda motivasiya mərhələsində Aral dənizinin quruması, Afrikanın səharalaşması,Amazon meşələrinin qırılması nəticəsində yaranan problemləri araşdıraraq mövzuya maraq artırır ki,bu tənqidi təfəkkürün inkişafına şərait yaradır. Təsərrüfatın sahə quruluşu mövzusunda cədvəl üzərində iş təbii resusların əldə edilməsi və emal edilməsi haqqında motivasiya bloku mövzuya maraq yaradır və məntiqi təfəkkürü inkişaf etdirərək prosedural bilikərin əldə edilməsini təmin edir.Maddi və qeyri-maddi istehsal sahələri mövzusunda verilmiş foto şəkillərdə istehsal sahələri və təbii ehtiyyatlar arasında əlaqəni göstərir.Bazar iqtisadiyyatı mövzusunda müxtəlif məhsulların satışı üzərində qurulan motivasiya olduqca maraqlı mətn və şəkillərdən istifadə edərək məhsulun satış bazarını nümayiş etdirir ki,bu da yaradıcı təfəkkürün inkişafına imkan verir. 9-cu sinif coğrafiya kurikulumunda motivasiya blokları olduqca maraqlı olmaqla yanaşı, mövzu üzərində daha çox düşünməyə və mövzu haqqında tətqiqatın aparılmasına istiqamətlənmişdir. (8). **X sinif** coğrafiya kurikulumunda təbii ehtiyyatlar və onların istifadəsi mövzularının motivasiya mərhələsində araşdırılmasını həyata keçirsək görərik ki, iqlim ehtiyyatları fəsilindəki mövzuların bəzilərində bu təbii ehtiyyatın və onun istifadə dünya və ölkəmizə aid mövzularda bəzi mövzularda motivasiya bloku xəritə, sxem və mətn şəkilində verilmiş olsada bəzi mövzularda iqlim ehtiyyatları və onların istifadəsinə dair suallar bloku vasitəsi ilə verilmişdir. Motivasiya bloklarında verilən xəritə, sxem və cədvəllərdə dünya və ölkəmiz üzərində iqlim ehtiyyatlarının paylanmasına və aqroiqlim ehtiyyatlarına diqqət çəkir. Ölkəmizin çayları mövzusunda motivasiya mərhələsində verilmiş “xəbərlər” blokunda Kür çayının daşması nəticəsində ətraf rayonlara vurduğu ziyanlar barəsində də məlumat verir. Bu blok vasitəsi ilə hidroehtiyyatların insan təsərüfatına müsbət təsiri ilə bərabər ciddi ziyanlarda vurduğunu görə bilərik.Buzlaq və bataqlıqlar; Yeraltı sular və Xəzər dənizi mövzularında motivasiya bloklarında şəkillər, mətn və şəkil üzərində iş vasitəsilə bu hidroehtiyyatlara və onlardan istifadəyə dair motivasiya blokları vasitəsi ilə məntiqi təfəkkürün inkişafı verilmişdir. Coğrafi təbəqə fəsilində verilən mövzularda coğrafi təbəqənin arasında əlaqəni təmin edən Günəş enerjisi, hidrosfer, atmosfer və biosfer təbii ehtiyyatları arasında əlaqəsinə dair motivasiya blokları verilmişdir. Bloklar vasitəsiyilə ölkəmizin fiziki-coğrafi bölgüləri və bu bölgülərdə təbii ehtiyyat amilini diqqətə çatdırır. Dünyanın hasilat və emaledici sənayesi mövzularında verilən fotoşəkillər vasitəsi ilə təbii ehtiyyatlar və onların sənayedə istifadə olunmasına dair motivasiya bloku qoyulmuşdur ki,bu blok vasitəsilə vizual olaraq təbii ehtiyyatlar və onların iqtisadi əhəmiyyətinə dair rahatlıqla məlumat almaq münkündür. Dünyanın kənd təsərrüfatı mövzusunda bioehtiyyatlar və onlardan istifadəsinə dair motivasiya bloku verilmiş, Nəqliyyat coğrafiyası mövzusunda isə təbii ehtiyyatların daşınmasına dair şəkil vasitəsilə motivasiya bloku verilmişdir. **XI sinif** coğrafiya kurikulumunda təbii ehtiyyatlar və onların istifadəsinə dair motivasiya blokunu tətqiq edək. Təbiətdən düzgün istifadə fəsilində mineral ehtiyyatlar və onlardan istifadə mövzusunun motivasiya blokunda mineral ehtiyyatlar müxtəlif qruplara ayrılmış və onların adları qeyd edilmişdir ki,bu mövzunun ilkin baxışdan nədən bəhs edəcəyinə dair şagirddə mövzuya maraq oyadır. Bu fəsildə iqlim və insan sağlamlığı, quru sularından istifadə,dünyanın torpaq fondu,

meşə resursları və onların istismarı mövzularında motivasiya blokunda şagirdlərə "sizə məlumdur" başlığı ilə bu ehtiyyatlardan istifadə edilməsinə dair verilən müxtəlif məlumatlar onlarda mövzuya maraq yaratmağa və tətqiqatı düzgün aparmağa imkan verir.

## Nəticə

Araşdırmalardan məlum oldu ki, siniflər üzrə motivasiya mərhələsində təbii ehtiyyatlar və onların istifadəsi varislik prinsipinə uyğun sadədən mürəkkəbə doğru verilmişdir. Motivasiya blokları şəkil, mətn, xəritə, xəritə-sxem, cədvəl, dioqram, xəbər və s. kimi başlıqlarla verilərək mövzuya istiqamətlənməni, tətqiqatı düzgün şəkildə aparmanı təmin edir.

## Ədəbiyyat

1. Seyfullayeva, N. Methods of teaching geography.
2. Geography textbook for 6th textbook and methodical aids for 6th grade teachers.
3. Geography 7th grade textbook and methodical aid for 7th grade teacher.
4. Geography 8th grade textbook and methodical aid for 8th grade teacher.
5. Geography 9th grade textbook and methodical aid for 9th grade teacher.
6. Geography 10th grade textbook and methodical aid for 10th grade teacher.
7. Geography 11th grade textbook and methodical aid for 11th grade teacher.
8. https://www.e-derslik.edu.az/portal/

Göndərildi: 12.05.2021 Qəbul edildi: 16.07.2021

DOI: 10.36719/2706-6185/04/38-41

**Mahirə Adil qızı Cabbarova**
Bakı Dövlət Universiteti
magistrant
mahirecabbarova8@gmail.com

# «İQTİSADİYYATIN ƏSASLARI» FƏNNİNİN COĞRAFİYAYA TƏTBİQ EDİLMƏSİ VƏ ƏHƏMİYYƏTİ

**Xülasə**

Ümumtəhsil məktəblərində coğrafiya bir çox elmlərlə inteqrasiya olunmuş şəkildə tədris olunur. Coğrafiyanın iqtisadiyyatla inteqrasiyası daha çox diqqəti cəlb edir. İqtisadiyyat bəşər tarixinin ilk dövrlərindən insan fəaliyyətinin əsas sahəsi olmuşdur. Şagirdlərə iqtisadi biliklərin öyrədilməsi müxtəlif illərdə müxtəlif formalarda olmuşdur. İqtisadiyyata aid biliklərin öyrənilməsi və möhkəmləndirilməsi müasir məktəb təcrübəsində sadə-kompleks prinsipinə uyğun olaraq həyata keçirilir.

***Açar sözlər:*** *istehsal, istehlak, tələb, təklif, əmək haqqı, əmək bölgüsü, iqtisadiyyat*

**Mahira Adil Jabbarova**
Baku State University
master student
mahirecabbarova8@gmail.com

## Application and importance of the subject "Fundamentals of economy" to geography

**Abstract**

Geography is taught in general education schools in an integrated manner with many sciences. The integration of geography with economics attracts more attention. Economy has been the main field of human activity since the early days of human history. The teaching of economic knowledge to students has been in different forms in different years. The study and strengthening of knowledge related to economics is carried out in modern school practice in accordance with the principle of simple-complex.

***Keywords:*** *production, consumption, demand, supply, wages, division of labor, economy*

## Giriş

İqtisadiyyat bəşər tarixinin yaranması ilə birgə meydana gələn, cəmiyyət həyatının təməlini təşkil edən insan fəaliyyətinin ən mühüm sahəsidir. İstehsalla məşğul olan, arzuladıqları nemətləri: əmtəə və xidmətləri əldə etmək üçün könüllü mübadiləyə girəninsanların davranışları iqtisadiyyat adlanır.Məşhur ingilis iqtisadçısı olan Con Meynard Keyns iqtisadiyyat haqqındakı fikirlərini 1930-cu illərdəki «böyük depressiya» zamanı yazırdı: «İqtisadiyyat nəzəri doktorinadan daha çox bir üsul, bir metod deməkdir. O, insan beyninin düzgün nəticələr çıxarma üçün istifadə etdiyi bir cihaz, bir düşüncə tərzidir.» Bütün iqtisadi bilik sahələrinin, iqtisadi nəzəriyyənin araşdırdığı, öyrəndiyi ən əsas obyekt iqtisadiyyatdır (İsmayılov, 2010: 328).

İqtisadiyyat və onu öyrənən iqtisadiyyat elmi yalnız iqtisadçı və ya idarəedənlər üçün deyil, ixtisasından asılı olmayaraq bütün vətəndaşlar və təhsil alanlar üçün vacib bir bilik sahəsidir. Buna görə də ümumitəhsil məktəblərində şagirdlərə iqtisadiyyata aid əsas anlayışların tədris edilməsi XXI əsrin əsas tələblərindən biridir. Ənənəvi təlim sistemində Coğrafiya fənninin tədrisi zamanı iqtisadi-coğrafi biliklərə çox az yer verilmişdir. Ənənəvi coğrafiya tədrisində iqtisadi - coğrafi biliklər müasir coğrafiya tədrisindən fərqli olaraq konkret siniflərdə tədris olunurdu. İqtisadi və fiziki – coğrafi biliklər bir-birindən təcrid olunmuş şəkildə tədris olunurdu. Azərbaycan Respublikasının iqtisadi və sosial coğrafiyası

VIII sinifdə, Dünyanın iqtisadi coğrafiyası IX sinifdə tədris olunurdu. XI sinif «Türk dünyasının coğrafiya» tədris vəsaitində türk dünyası ölkələrinin həm fiziki, həm də iqtisadi coğrafiyası tədris olunurdu (Seyfullayeva, 2011: 394).

İqtisadiyyata aid biliklərin azlığı səbəbindən kurikuluma qədərki dövrdə IX-XI siniflər üçün Azərbaycan Respublikasının Təhsil Nazirliyi tərəfindən təstiq edilmiş «İqtisadiyyatın əsasları» dərsliyi nəşr olunmuşdur. Teymur Vəliyev və Nüsrəddin Məmmədovun müəllifi olduqları dərslik «XƏZƏR» nəşriyyatında nəşr olunmuşdur. Dərsliyin sonuncu buraxılışı 2008-ci ildə 160 səhifə, 10 fiziki çap vərəqindən ibarət olan dərslikdir. Dərslik məktəblərə pulsuz paylanmamış, qiyməti 3 manat 20 qəpik təşkil etmişdir (Vəliyev, Məmmədov, 2008: 200).

«İqtisadiyyatın əsasları» dərsliyi 10 bölmə 57 mövzudan ibarət idi. «İqtisadiyyatın əsasları» fənninin əsas məqsədi sovet iqtisadi sistemindən xilas olduqdan sonra Azərbaycanın daha mütərəqqi sistem olan bazar iqtisadiyyatına keçidi, bazar iqtisadiyyatının təbiəti və onun inkişaf qanunauyğunluqları haqqında hər bir yeniyetmə, tələbə və ümumilikdə, hər bir vətəndaşın zəruri biliklərə malik olmasıdır. Tədris vəsaitində dünya iqtisadi sistemi, onun mahiyyəti, əsas xüsusiyyətləri və digər problemlər haqqında yetərincə məlumat verilmişdir. «İqtisafiyyatın əsasları» fənni iqtisadi biliklərin əsaslarının öyrənilməsində mühüm rol oynamışdır.

«İqtisadiyyatın əsasları» dərsliyinin I bölməsində - «İqtisadiyyatın əsasları» fənninin ümumi giriş mövzuları» bölməsində fənnin məqsəd və vəzifələri, iqtisadi qanun və kateqoriyalar, iqtisadi tələbat, iqtisadiyyatın makroiqtisadiyyat və mikroiqtisadiyyat növləri haqqında məlumatlar verilmişdir (İqtisadiyyat, 2007: 202).

II bölmə olan «İqtisadi sistem» tədris vahidində iqtisadi sistem haqqında hər bir vətəndaşın bilməsi zəruri olan biliklər verilmişdir. İqtisadi sistemin mahiyyəti və onun növləri haqqında, iqtisadi sistemlərdə olan mülkiyyət və onun formalaşma tarixi, onun obyektləri və subyektləri haqqında vacib məlumatlar verilmişdir. Bundan əlavə bu bölmədə əmək prosesi, maddi nemətlərin istehsalı, istehsal vasitələri və qüvvələri, iqtisadi münasibətlər, aqrar münasibətlər, istehsal amilləri və elmi-texniki tərəqqi haqqında ilkin zəruri biliklər verilmişdir.

«Əmək» adlanan III bölmədə əmək və onun mahiyyəti, əməyin fəaliyyəti, onun hansı növlərinin olması, əmək bölgüsü, əməyin iqtisadi qanun olması, əmək bölgüsü haqqında bir çox ingilis iqtisadçılarının fikirləri, əmək ehtiyyatları və onların düzgün istifadə olunması formaları, işsizlik və işsizliyin hansı növlərinin olması, əmək məhsuldarlığı, əmək intensivliyi və əmək intizamı kimi iqtisadiyyatın əsas mövzularına toxunulmuş, bunlar haqqında şagirdlərdə ilkin və hər bir vətəndaşın bilməli olduğu zəruri biliklər verilmişdir (Şabanova, Seyfullayeva, Əlizadə, Aktoprak, 2018: 160).

«İstehsal və istehlak» adlı IV bölmədə istehsal, onun növləri və hansı səbəblərdən zəruri olması, ümumi milli məhsul (ÜMM), son və aralıq məhsul, ehtiyyat fondları, ümumi daxili məhsul (ÜDM), istehlak və onun istehsalla qarşılıqlı əlaqəsi, istehsal xərcləri və alternativ xərclər, istehsalın səmərəliliyi, Azərbaycanın iqtisadi (istehsal) potensialı, iqtisadi inkişaf səviyyəsi, onun strukturu məsələlərindən bəhs olunmuşdur.

V bölmədə - «Bazar iqtisadiyyatı və onun məzmunu» tədris vahidində natural və əmtəə istehsalı, fərdi və ictimai dəyər, ticarət və onun növləri, bazar iqtisadiyyatının mahiyyəti, onun üstünlükləri, birja, onun yaranma tarixi və növləri, marketinq, onun vəzifəsi və yaranmasını zəruri edən səbəblər, tələb və təklif, rəqabət, formaları, mahiyyəti və metodları, Azərbaycanda bazar iqtisadiyyatına keçidin zəruriliyi, onun xüsusiyyətləri və keçidin çətinlikləri haqqında IX-XI sinif şagirdləri üçün geniş sayıla biləcək məlumatlar verilmişdir (Qəribov, Seyfullayeva, Hümbətova, Şabanova, İsmayılova, 2018: 144).

«Pul, maliyyə, kredit» adlanan VI bölmədə pul, onun mahiyyəti, yaranma tarixi, funksiyaları, maliyyə, büdcə və onun növləri, vergi sistemi, vergilərin birbaşa (müstəqim) və dolayı növləri, vergi siyasəti, onun vəzifələri, kredit və bank işi, infilyasiya və onun baş vermə səbəbləri barədə şagirdlərin yaş səviyyəsinə uyğun olaraq ətraflı məlumat verilmişdir.

«Sahibkarlıq fəaliyyəti» adlı tədris vahidində sahibkarlıq və onun mahiyyəti, növləri, kiçik sahibkarlığın üstünlükləri, biznes fəaliyyəti və onun etikası, inhisar (təkəlçilik) və antiinhisar (antitəkəlçilik), dövlət əmlakının özəlləşdirilməsi, Azərbaycanda azad sahibkarlıq və onun növləri haqqında önəmli ilkin məlumat verilmişdir (Eminov, Səmədov, Əliyeva, 2019: 192).

«Sosial iqtisadiyyat» adlanan VIII bölmədə həyat səviyyəsi və onun xüsusiyyətləri, əmək haqqı, əmək haqqının real və nominal formaları, ona təsir edən amillər, işsizlik və onun aradan qaldırılması yolları, sosial müdafiə və sosial təminat, demoqrafiya və Azərbaycanda demoqrafik inkişafin xüsusiyyətləri haqqında geniş sayıla biləcək məlumatlar verilmişdir.

IX bölmədə - «İqtisadiyyatın idarə edilməsi» tədris vahidində iqtisadi idarəetmə,onun mahiyyəti və prinsipləri, iqtisadiyyatın dövlət tərəfindən tənzimlənməsi, idarəetmə orqanları, menecment, istehsalın idarə edilməsi, idarəetmə sisteminə nəzarət mövzularına toxunulmuş, bu mövzular haqqında şagirdlərə əhatəli məlumat verilmişdir.

«Dünya təsərrüfat sistemi» adlanan X bölmədə dünya təsərrüfat sisteminin mahiyyəti və onun əsas xüsusiyyətləri, beynəlxalq əmək bölgüsü və bu zaman Azərbaycanın qarşısında duran vəzifələr, Azərbaycan Respublikasının xarici iqtisadi münasibətləri və onların xüsusiyyətləri, birgə sahibkarlığın əhəmiyyəti, kapital ixracı, ekologiya mövzuları haqqında IX-XI sinif şagirdləri üçün geniş və gələcək həyatlarında da istifadə edə biləcəkləri məlumatlar verilmişdir (Əlizadə, Seyfullayeva, Aktoprak, Şabanova, 2020: 204).

Müasir dərsliklərin nəşr edilməsi ilə coğrafiya dərsliklərinin strukturu da köklü surətdə dəyişdi. Yeni dərliklərdə iqtisadi və fiziki-coğrafi biliklər bir – biri ilə inteqrasiya olunmuş şəkildə verilmişdir. Eyni zamanda yeni dərsliklər tətbiq olunduqdan sonra artıq «İqtisadiyyatın əsasları» tədris vəsaitindən istifadə edilməməyə başlanıldı. İqtisadiyyata aid biliklər də yeni dərsliklərdə coğrafi biliklərlə birlikdə, inteqrasiya olunmuş şəkildə verilmişdir. Ənənəvi təlimdə dərslik strukturunun əsas hissəsini mətn komponentləri təşkil edirdi. Eyni zamanda, digər ənənəvi dərsliklər kimi «İqtisadiyyatın əsasları» tədris vəsaitində də illustirativ materiallardan istifadə edilməmişdir. Həmçinin yuxarı sinif şagirdləri ixtisasla bağlı əsas fənnləri öyrənməyi üstün tutduğundan və bu sahədə ixtisaslı müəllim çatışmamağı səbəbindən bu fənnə maraq çox az idi. Bu səbəbdən «İqtisadiyyatın əsasları» fənninin coğrafiyaya tətbiq edilməsinin çox böyük əhəmiyyəti olmuşdur.

Müasir dərsliklərdə iqtisadiyyata aid biliklər ayrıca bir dərslik, bölmə şəklində deyil, hətta heç ayrıca mövzu şəklində də tədris edilmir. Bu biliklər demək olar ki, bir çox mövzunun içərisində coğrafi biliklərlə inteqrasiya olunmuş formada verilmişdir. Eyni zamanda iqtisadiyyata aid biliklər şagirdlərin psixoloji xüsusiyyətləri nəzərə alınaraq siniflər üzrə asandan-çətinə prinsipinə uyğun paylanmışdır. Yuxarı siniflərə qalxdıqca məlumatlar daha da mürəkkəbləşir. VI sinif Coğrafiya dərsliyində «Cəmiyyət» və «Təbiət və İnsan» tədris vahidlərində iqtisadiyyata aid ilkin biliklər şagirdlərin yaşına uyğunlaşdırılaraq verilmişdir. Bu dərslikdə verilmiş iqtisadiyyata aid terminlər «İqtisadiyyatın əsasları» dərsliyinin «Əmək» və «İstehsal və istehlak» tədris vahidlərinə uyğun gəlir. Bu terminlərə istehsal, istehlak, əmək bölgüsü, mənimsəmə iqtisadiyyatı və s. iqtisadi termin və anlayışlar daxildir. Bu terminlər şagirdlərdə iqtisadiyyata giriş üçün ilkin təsəvvürlər formalaşdırılmasına yaxından kömək edir (Babayeva, Hüseynli, Alxasov, Qəribov, 2018: 208).

VII sinif Coğrafiya dərsliyində «Dünya dövlətlərinin müxtəlifliyi» və «İqtisadiyyat və coğrafiya» tədris vahidlərində verilmiş iqtisadi termin və anlayışlar «İqtisadiyyatın əsasları» dərsliyinin «Əmək», «Pul, maliyyə, kredit», «Sahibkarlıq fəaliyyəti», «İqtisadiyyatın idarə edilməsi» və «Dünya təsərrüfatı sistemi» tədris vahidlərində verilmiş terminlərə uyğundur. Əsas fərq ondan ibarətdir ki, VII sinif Coğrafiya dərsliyində verilmiş termin və anlayışlar yuxarıdakı bölmələri tamamilə əhatə etmir, şagirdlərin daha asan qavraması, yadda saxlaması və ondan praktikada daha asan istifadə edə bilməsi məqsədilə VI sinif Coğrafiya dərsliyinə nisbətən daha çətinləşdirilmiş variantlarda şagirdlərə tədris olunur. Bu terminlərə idarəetmə, dünya təsərrüfatı, pul, ticarət, sərmayə, kapital resursları, investisiya və s. iqtisadi terminlər daxildir.

VIII sinif Coğrafiya dərsliyind «Dünya ölkələrinin təsnifatı» və «Əhali və təsərrüfatın ərazi təşkili» tədris vahidlərində verilmiş iqtisadi termin və anlayışlar «İqtisadiyyatın əsasları» dərsliyindəki «İstehsal və istehlak», «Bazar iqtisadiyyatı və onun məzmunu» və «Dünya təsərrüfatı sistemi» tədris vahidlərində verilmiş təsərrüfatın strukturu, ümumi milli məhsul (ÜMM), ümumi daxili məhsul (ÜDM), coğrafi əmək bölgüsü, əmtəə və s. iqtisadi termin və anlayışlara uyğun gəlir.

IX sinif Coğrafiya dərsliyində «Qədim və müasir sivilizasiyalar», «Dünya əhalisinin müxtəlifliyi» və «İqtisadi-sosial həyat və onun inkişaf yolları» tədris vahidlərində verilmiş marketinq, işsizlik səviyyəsi, tələb, təklif, mülkiyyət formaları, ticarət, bazar, əmək haqqı, bazar iqtisadiyyatı, rəqabət, sahibkarlıq, vergi və s. kimi iqtisadi termin və anlayışlar «İqtisadiyyatın əsasları» dərsliyindəki «Bazar iqtisadiyyatı və onun məzmunu», «Pul, maliyyə, kredit», «Sahibkarlıq fəaliyyəti» və «Sosial iqtisadiyyat» bölmələrində verilmiş iqtisadi termin və anlayışlara uyğundur (İmrani, Şabanova, Seyfullayeva, 2018: 208).

X sinif Coğrafiya dərsliyində «Siyasi münasibətlər» və «Elmi-texniki inqilab və iqtisadiyyat» tədris vahidlərində şagirdlərə tədris olunan elmi-texniki inqilab (ETİ), istehlak, iqtisadi mərkəz, elmi-texniki tərəqqi (ETT), beynəlxalq coğrafi əmək bölgüsü və s. iqtisadi termin və anlayışlar «İqtisadiyyatın əsasları» tədris vəsaitinin «İstehsal və istehlak», «İqtisadi sistem» tədris vahitlərində verilmiş termin və anlayışlarla uyğunluq təşkil edir.

XI sinif Coğrafiya dərsliyində isə «Dünyanın demoqrafik mənzərəsi», «İqtisadi inkişafın istiqamətləri» və «Beynəlxalq inteqrasiya və qloballaşma» tədris vahidlərində «İqtisadiyyatın əsasları» tədris vahidindəki «İstehsal və istehlak», «Bazar iqtisadiyyatı və onun məzmunu» və «Pul, maliyyə, kredit» bölmələrirdə verilmiş iqtisadi biliklərə uyğun biliklər tədris olunur. XI sinif Coğrafiya dərsliyində verilmiş iqtisadi terminlərə lizinq, ixaracat, alıcılıq qabiliyyəti, inflyasiya, valyuta bazarı, kredit və digər termin və anlayışlar daxildir.

Dərsliklərin hər birinə yaxından nəzər saldıqda aydın bir şəkildə görmək olar ki, yuxarı siniflərə qalxdıqca dərsliklərdə verilən iqtisadiyyata aid terminlərin də miqdarı və çətinlik dərəcəsi xeyli artır. Bu artım şagirdlərin bilik və yaş səviyyəsinə mütənasib olaraq dəyişir ki, bu da öyrənmə prosesinin daha maraqlı, daha intensiv və məqsədəuyğun təşkil edilməsinə səbəb olur.

## Nəticə

İqtisadiyyatın əsasları fənni 2013-cü ildən etibarən ümumtəhsil məktəblərində Coğrafiya fənninin tərkibində tədris edilməyə başlanıldı.İqtisadiyyatın əsasları fənninin Coğrafiya fənninə tətbiq edilməsinin bir sıra üstünlükləri vardır. Belə ki, hər iki dərsliyin birləşdirilməsi nəticəsində şagirdlər əlavə dərs yükündən azad oldular. (11). Yuxarı siniflərdə iqtisadiyyata aid biliklərin tədris edilməsinə əlavə saat ayrılırdı ki, bu da, şagirdlərin daha çox məlumatla yüklənməsinə, nəticədə, onların ümumilikdə tədrisə maraqlarının azalmasına səbəb olurdu. Eyni zamanda şagirdlər birdən-birə yeni terminlərlə tanış olurdular ki, bu onlarda qorxu yaranmasına səbəb olurdu. İqtisadiyyatın əsasları fənninin Coğrafiya fənninə tətbiq edilməsi nəticəsində iqtisadiyyata aid biliklər aşağı siniflərdən başlayaraq şagirdlərə tədris edilməyə başlayır. Bunun əsas əhəmiyyəti ondan ibarətdir ki, şagirdlər iqtisadiyyata aid bilikləri coğrafiya fənninin tədrisi prosesində öyrənir və beləliklə də, öyrəndikləri materialları həyatla daha asan əlaqələndirə bilirlər. Coğrafiya dərsliklərində iqtisadiyyata aid biliklərin verilməsi nəticəsində məktəblilər iqtisadiyyatın önəmini daha yaxşı başa düşürlər.

## Ədəbiyyat

1. İsmayılov, Ç. (2010). «İqtisadi və sosial coğrafiyanın əsasları». Bakı. 328 s.
2. Seyfullayeva, N. (2011). «Coğrafiyanın tədrisi metodikası». «EMK» nəşriyyatı. Bakı. 394 s.
3. Vəliyev, T., Məmmədov, N. (2008). «İqtisadiyyatın əsasları».Xəzər. IX-XI siniflər üçün. 200 s.
4. «İqtisadiyyat». (2007). Bakı. 202 s.
5. Şabanova, Y., Seyfullayeva, N., Əlizadə, E., Aktoprak, İ. (2018). «Coğrafiya». Bakı. 160 s.
6. Qəribov, Y., Seyfullayeva, N., Hümbətova, Ş., Şabanova, Y., İsmayılova, T. (2018). «Coğrafiya» Bakı. VII sinif üçün. 144 s.
7. Eminov, Z., Səmədov, Q., Əliyeva, A. (2019). «Coğrafiya». Çaşıoğlu VIII sinif üçün. 192 s.
8. Əlizadə, E., Seyfullayeva, N., Aktoprak, İ., Şabanova, Y. (2020). «Coğrafiya». Bakı nəşr. IX sinif üçün. 204 s.
9. Babayeva, M., Hüseynli, Ş., Alxasov, O., Qəribov, Y.(2018). «Coğrafiya». Bakı. X sinif üçün. 208 s.
10. İmrani, Z., Şabanova, Y., Seyfullayeva, N. (2018). «Coğrafiya». Bakı. XI sinif üçün. 208 səh.
11. www.wikipedia.org

Göndərildi: 20.04.2021 Qəbul edildi: 05.05.2021

DOI: 10.36719/2706-6185/04/42-46

**Jamila Rashadat Majidli**
Baku State University
master student
majidlijamila@gmail.com

# THE INTERNATIONAL CASES CONCERNING JOINT DEVELOPMENT AGREEMENTS
## (The Case of Saadia Arabia-Bahrain, Japan-South Korea, Thailand-Malaysia)

**Abstract**

This article is dedicated to analysing the joint development agreements resolving or temporarily suspending maritime boundary disputes cases between Japan-South Korea, Saadia Arabia-Bahrain, and Thailand-Malaysia. Regardless of whether any delimitation line exists or not, international law allows the parties to agree on delimitation by consulting on the most appropriate conditions or jointly operate on the disputed zone, field or maritime border. If the cross-border dispute on hydrocarbon resources exists, the conclusion of a unitization agreement is not ruled out by the international practice as much. This article identifies the features of the joint development agreements, divides them into the three models recognized internationally, analyzes the main characteristics of each model of the joint development agreements through historical important precedents. Furthermore, the research lets daylight into the essential statements that regulate the fiscal regime, share proportion issues, the sovereign right, and the right to use subsoil and the seabed, within the agreements.

***Key words:*** *maritime boundary disputes, joint development agreements, unitization agreements, delimitation, joint development zone, international cases, demarcation of the continental shelf, seabed, disputes on petroleum reservoir, oil fields, production share agreements*

**Cəmilə Rəşadət qızı Məcidli**
Bakı Dövlət Universiteti
magistrant
majidlijamila@gmail.com

## Birgə inkişaf sazişləri ilə bağlı beynəlxalq işlər
## (Səudiyyə Ərəbistanı-Bəhreyn, Yaponiya-Cənubi Koreya, Tayland-Malayziya nümunəsi)

**Xülasə**

Bu məqalə Yaponiya-Cənubi Koreya, Səudiyyə Ərəbistan-Bəhreyn və Tayland-Malayziya arasında dəniz sərhədi mübahisələrini həll edən və ya müvəqqəti dayandıran birgə inkişaf sazişlərinin təhlilinə həsr edilmişdir. Hər hansı delimitasiya xəttinin olub-olmamasından asılı olmayaraq, beynəlxalq hüquq tərəflərə ən münasib şərtlərlə məsləhətləşmələr aparmaqla delimitasiya haqqında razılığa gəlməyə və ya mübahisəli zona, sahə və ya dəniz sərhədində birgə fəaliyyət göstərməyə imkan verir. Əgər karbohidrogen ehtiyatları ilə bağlı transsərhəd mübahisəsi varsa, birləşdirmə sazişinin bağlanması beynəlxalq təcrübədə o qədər də istisna edilmir. Bu məqalə birgə inkişaf sazişlərinin xüsusiyyətlərini müəyyən edir, onları beynəlxalq səviyyədə tanınan üç modelə ayırır, tarixi mühüm presedentlər vasitəsilə birgə inkişaf sazişlərinin hər bir modelinin əsas xüsusiyyətlərini təhlil edir. Bundan əlavə, tədqiqat müqavilələr çərçivəsində fiskal rejimi, pay nisbəti məsələlərini, suveren hüququ, yerin təkindən və dənizin dibindən istifadə hüququnu tənzimləyən əsas ifadələrə aydınlıq gətirir.

***Açar sözlər:*** *dəniz sərhədi mübahisələri, birgə inkişaf sazişləri, vahidləşdirmə sazişləri, delimitasiya, birgə işlənmə zonası, beynəlxalq işlər, kontinental şelf, dəniz dibinin demarkasiyası, neft anbarı, neft yataqları üzrə mübahisələr, hasilatın pay bölgüsü sazişləri*

## Introduction

Maritime border disputes generally derived from the not-delimited zones, the claims of the coastal states disagreeing with the delimitation defined before, the hydrocarbon or other natural resources located in the disputed areas, or overlapped each other, etc. International law does not regulate the direct solution of the settlement of the disputes, unlike the appropriate provisions of UNCLOS (Article 123) (The United Nations Convention on the Law of Sea, 1982: 123) and the other Conventions advising the cooperation of the parties and come to an agreement. However, international practice on this matter shows that there are mainly three ways to resolve the maritime border disputes and disputes on the natural resources located within the disputed areas. Those are 1) the delimitation of the maritime borders by the parties through a bilateral or multilateral agreement, 2) conclusion of Joint development agreements and establishing joint developing zone between the parties, 3) coming into an agreement on unitization of a deposit (reservoir) (2).

## 1. The Joint Development Agreements

Joint development agreements are concluded to jointly develop a specific zone or a natural reservoir located on the seabed or continental shelf by the countries (usually two countries) and share the revenues in order to agree on proportions of each country (Joint Development Agreements: Legal Structure and Key Issues Professor Peter Cameron and Professor Richard Nowinski, 7). Joint development agreements are a temporary solution when the delimitation of the seabed/continental shelf cannot be identified and cannot be reached any agreement by the parties.The countries can conclude the joint development agreements either when the delimitation boundary exists or not. Mainly,three models of the joint development agreements are exerted (Cross-Border Unitization and Joint Development Agreements, 415).

## 2. Single-State Model

Single-State Model, in which the shares are divided equally, but only one state administrates the joint development zone or the disputed/ overlapping oil-gas field, and the other states observe the development and managing the zone/field. The most known example of the single state model is the Bahrain-Saadia Arabia boundary agreement concluded on 22nd February 1958. By the mutual agreement of the leaders of the botch countries, the hexagonal area of the overlapped claims was entirely ascribed to Saadia Arabia. At this moment, Saadia Arabia had become the factual owner of this area. The hexagonal area, including the islands, began to be under the jurisdiction of Saadia Arabia; in return for this, the revenues should be portioned out equally, one-half of the revenues for each party. In the Agreement, the location of the six-point is defined with the longitudes and the latitudes. The exploration and exploitation rights are granted to Saadia Arabia because the right to use seabed and subsoil are entirely attributed to Saadia Arabia through this Agreement (Bahrain-Saudi Arabia boundary agreement, 1958). Unlike the other joint development agreements, this boundary agreement was concluded, although a delimitation line based on the median line principle existed, for the reason of regulating the overlapped oil-gas fields (The Joint Development of Offshore Oil and Gas in Relation to Maritime Boundary Delimitation Masahiro Miyoshi, 27).

## 3. Two states/joint venture model

Two states/joint venture model, in which the joint development zone is regulated by the concessionaries or the companies appointed by each party. In this type, each country has the right to explore and exploit the natural reservoir in terms of the concluded Agreement. "The Agreement between Japan and the Republic of Korea (South Korea) concerning joint development of the southern part of the continental shelf adjacent to the two countries" as an example of joint venture model is still the core primary agreement among the joint development agreements (The joint development of offshore oil and gas in relation to maritime boundary delimitation Masahiro Miyoshi, 27) The Agreement was concluded on 30th January, 1974 and first of all, addressed to promote the friendly relations between the two countries, further jointly exploration and exploitation of the petroleum resources situated in the south of the continental shelf adjacent to both countries. This Agreement

